**Mufti Abdul-Aziz Ali Şeyx:**

**"Azərbaycan haqda verilmiş suallara cavab"**

**Mədinə İslam Unversitetində təhsil alan qardaşlardan biri Səudiyyənin Muftisi Abdul-Aziz Ali Şeyxin**
**qəbulunda olub və ona ona ölkəmiz haqında bir neçə sual vermişdir.**
**Onları (mp3, video və mətn formatında) sizlərə təqdim edirik.**

**Sual:**
**Əhalisinin əksəriyyəti cahil olan bir ölkədə namazı tərk etməyin, ölülərdən və ya dirilərdən kömək diləməyin, qəbirlərin ətrafında təvaf etməyin küfr əməl olduğunu bilməyən, cahillikləri üzündən Allaha şərik qoşan və bu əməllərinin Allaha yaxınlaşdıran bir vasitə olduğunu hesab edən kəsləri- onlara hüccət çatdırmadan, (yəni əməllərinin şirk və küfr olduğunu quran və sünnə dəlilləri ilə açıqlamadan) öncə onlara kafir deyə bilərikmi?**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Elm əhli cahillərə haqqı bəyan etməli, onları öyrətməli və Allahın doğru yoluna istiqamətləndirməlidirlər. Çünki elmi olmayan cahil öyrədilməlidir. Allahu təalə öz peyğəmbərinə (sallAllahu aleyhi və səlləm) buyurmuşdur: “Bil ki, Allahdan başqa ibadətə layiq olan haqq bir ilah yoxdur! Öz günahların üçün ondan bağışlanma dilə! (Muhəmməd surəsi, 19)” Ona görə də, cahillərə haqqı bəyan etmək və öz gerçəkliyi ilə tanıtdırmaq üçün hikmətlə, gözəl öyüd-nəsihətlə onları dəvət etmək lazımdır. Bizim həmin cahillərə qarşı mövqeyimiz, onlara inanıb, inanmamaq deyil, əksinə bizim onlara qarşı mövqeyimiz onları öyrətmək, başa salmaq və maarifləndirməkdir! Bunu ona görə etməliyik ki, onlar haqqı öz gerçəkliyi ilə tanıya bilsinlər! Bizdən tələb olunan bax budur! Biz həmin cahillərə tədricən tövhidi və Məhəmməd peyğəmbərə (sallAllahu aleyhi və səlləm) göndərilən şəriətin gerçəkliyini çatdırmalı, namazın vacibliyini və onun dinin ikinci əsası olduğunu bəyan etməli. Habelə, zəkatı, orucu və həcci onlara tanıtdırmalıyıq! Bu iş tədricən olmalıdır. İlk öncə onlara tövhidi başa salmalıyıq. Əgər onu başa düşsələr və ona riayət etsələr, bu zaman İslamın digər rükunlarını və vacibatlarınını hikmətlə, elmlə və mülayimcəsinə onlara bəyat etməliyik. Belə olduğu təqdirdə bəlkə Allah onların qəlblərini dinə meylli edər!**
**Sual:**
**Namaz qılmayan və ya Allahdan başqasından kömək diləyən kəsi təkfir edib (yəni, ona kafir deyib) kafirlərə aid olan şəriət hökmlərini ona tətbiq edə bilərikmi?**
**Şeyx Abdul-Aziz Ali Şeyx onun sözünü kəsərək:**
**Təkfirin əvəzinə Allahın dininə dəvət prinsipini tətbiq et! Dəvətlə məşğul ol və haqqı bəyan et! Dəvəti ön plana çək və onları tövhid əqidəsinə səslə! Allahın dinini onlara başa sal! Və onları Allahın dininə dəvət et! Əgər onları dəvət etsən və Allahın hüccətini (yəni, şəriətdə deyilən dəlil-sübutları) onlara çatdırsan, Allah özü onlarla nə edəcəyini yaxşı bilir!**

**Sual:**
**Yəni, hüccət çatdırmadan əvvəl təkdir etməli deyilik, eləmi?**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Sən onları tövhidə dəvət etməklə məşğul ol və haqqı onlara başa sal! Sən onlara haqqı başa saldıqdan və Allahın huccətini çatdırdıqdan sonra izzət və cəlal sahibi Allah, özü onlarla nə edəcəyini yaxşı bilir!**
**Sual:**
**Kafirə kafir deməyən özü kafirdir, fikrini səsləndirənlər barədə. Bizim ölkədə bəziləri bu prinsipi əsas götürüb, haqqında danışdığımız insanlara kafir deməyənlərə kafir deyirlər. Bu haqda nə deyə bilərsiniz?**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Heç bir müsəlman təkfir məsələsinə elmi olmadan girişməməlidir. Tətqiqatçı alimlərdən savayı heç kəs bu mövzuda fikir yürütməməlidir. Çünki bundan çaşqınlığa yol tapanlar çox olub. Kefimiz istəyən bir kəsə kafir adını verə bilmərik. Haqqı bildikdən sonra, inadkarlıq göstərib zəlalət yolu ilə gedən insan kafir olar! Elmsiz və bəsirətsiz bir vəziyyətdə insanı təkfir etməklə məşğul olmaq caiz deyildir.**
**Sual:**
**Əhalisinin əksəriyyəti Allaha şərik qoşan və namaz qılmayan bir ölkədə cənazə namazı aparılırsa, ölənin namaz qılan və ya tövhid əhli olduğunu soruşmağa ehtiyac varmı?**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Madam ki, o müsəlman ölkəsindədir, qılmaq lazımdır! Çünki əslində belə ölkələrin əhalisi inşəAllah, tövhid dinində olan müsəlmanlardır.**
**Sual:**
**Əgər əhalisinin 95%-i namaz qılmayan və Allaha şərik qoşandırsa soruşmağa ehtiyac duyulur?**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Ey qardaşım, tövhid dinində olan müsəlmanlar üçün namaz qılınar! Vəziyyətindən xəbərdar olmadığımız və öz həyatını yaşayan kəslər üçün cənazə namazı qılınar. Ölənin müşrik olduğunu bilsək, onun üçün namaz qılınmaz! Bilmədiyimiz halda isə əslinə baxaraq, ölən üçün namaz qılınar.**
**Sual:**
**Şəhadət kəliməsini deyib, lakin namaz qılmayanlar haqqında... Namaz qılmayanı kafir hesab edənlər, belələrinə cənazə namazı qılmırlar! Namaz qılmayanı kafir hesab etməyənlər isə, belələrinə cənazə namazı qılırlar.**

**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Bu ixtilaflı bir mövzudur. Onu kiməsə məcbur etdirmək olmaz!**
**Sual:**
**Şeyx, dediyim odur ki, bəziləri məsciddən çıxaraq həmin kəslər üçün cənazə namazı qılmırlar.**
**Şeyx Abdul-Aziz Ali Şeyx:**
**Xeyr, xeyr! Müsəlman olduğu bilinən, İslama mənsub olan və tək Allaha ibadət edən insan üçün cənazə namazının qılınması lazımdır!**

**Sual:**

**Azərbaycanda olan qardaşlarımıza tövhid, habelə təkfir və murciəliyə yol verməmək haqqında nə tövsiyyə edərdiniz?**

**Şeyx Abdul-Aziz Ali Şeyx:**

**Onlara Allahdan qorxmağı. Elm öyrənməyi və təkfirlə məşğul olmamağı tövsiyyə edirəm. Bu ən əsasdır. Qoy onlara faydalı olan şeyləri öyrənsinlər və haqqa əsaslansınlar. Təkfir mövzusuna gəlincə buna müdaxilə etməsinlər!**

**Mənbə:**

http://www.youtube.com/watch?v=u0INV27N8K4

http://selef-media.ucoz.ru/news/mufti_abdul_aziz_ali_seyx_az_rbaycan_haqda_verilmis_suallara_cavab_video_mp3_m_tn/2013-08-16-705